UOT: 634.2.232.234.

# YENİ İNTRODUKSİYA OLUNMUŞ GİLAS SORTLARI

**İ.A.BƏYƏHMƏDOV, R.Ü.MƏMMƏDOV**
**Quba Regional Aqrar Elm və İnnovasiya Mərkəzi**

*Məqalədə gilas bitkisinin respublikamıza yeni introduksiya edilmiş sortları, calaqaltıları, calaqaltıdan asılı olaraq əkin sxemləri, gilas bitkisinə verilən modern çətir formaları haqqında məlumat verilmişdir.*

***Açar sözlər:*** *Gilas sortları, gilasın calaqaltıları, introduksiya, əkin sxemləri, çətir formaları.*

Respublika əhalisinin meyvə və giləmeyvəyə olan ehtiyacı 116,2 % təmin olunur. Alma və armud məhsulu ilə də təmin olunma təxminən 100%-ə yaxındır. Lakin gilas meyvəsi ilə təmin olunma 87,1 %, gavalı meyvəsi ilə təmin olunma 72,0 %, fındıq meyvəsi ilə təmin olunma 214,2 %, badam meyvəsi ilə təmin olunma 7,1 % təşkil edir. Məlumdur ki, meyvə məhsulu ancaq daxili tələbat üçün deyil, eyni zamanda ixrac üçün becərilir. Yalnız onu qeyd etmək kifayətdir ki, Rusiya dünya alma idxalının 15%-ni təşkil edir. Buradan isə respublikamızın meyvə məhsulunun xarici bazara çıxarılması imkanlarının böyük olduğunu nəzərə alsaq yaxın gələcəkdə meyvə və giləmeyvə istehsalının artırılmasının vacib olduğunu qeyd etmək olar (2).

1975-1980-ci illərdən başlayaraq respublikamızda meyvə bağları genişləndirilərək başqa ölkələrdən yeni meyvə sortlarının introduksiyasına nail olunmuşdur ki, həmin illərdən meyvəçiliklə bağlı olan sahələrdə əsasən yerli, introduksiya edilmiş, MÇETİ-nin yeni yaradılmış seleksiya sortlarından istifadə olunaraq bağçılıq sahəsi getdikcə inkişaf etdirilmişdir Məhz həmin vaxtdan respublikamızda intensiv tipli bağların salınmasına (6x4m;5x4m;5x3m əkin sxemləri üzrə) başlanılmışdır (5;6;7).

Azərbaycan müstəqillik əldə etdikdən sonra ölkə qarşısında iqtisadiyyatın, zamanın tələbinə uyğun olaraq yenidən qurulması kimi həyati əhəmiyyətli problem dayandı. Həmin dövrdən başlayaraq respublikada meyvəçiliyin sabit inkişafını təmin etmək və bazar iqtisadiyyatının tələblərini nəzərə alaraq super intensiv tipli yeni bağlar salmaq günün ən vacib problemlərindən biri olaraq qarşıya çıxdı. Bu problemlərin həlli istiqamətində Quba Regional Aqrar Elm və İnnovasiya Mərkəzi ilə Meyvəçilik və Çayçılıq Elmi-Tədqiqat İnstitutu birgə respublikamızda bağçılıq mədəniyyətinin yüksəldilməsində, kəndli (fermer) təsərrüfatlarının vahid torpaq sahəsindən yüksək məhsul əldə edilməsində innovasiya yönümlü elmi tədqiqat işlərinin yekunlarının tətbiq edilməsinə, yeni mütərəqqi bağsalma texnologiyasının respublikamıza gətirilməsində, qərb ölkələrində özünü doğrultmuş meyvə sortlarının və virusdan azad calaqaltı formalarının introduksiya olunmasında xeyli işlər görmüşdür.

Eyni zamanda məlumdur ki, meyvə bitkilərinin məhsuldarlığına becərilmə şəraiti kəskin şəkildə təsir göstərir. Respublikamızın torpaq-iqlim şəraiti meyvə bitkilərinin yüksək məhsul vermələri üçün tamamilə uyğundur. Lakin buna baxmayaraq respublika üzrə meyvə bitkilərinin ümumi məhsuldarlığı çox aşağı olmaqla, 2017-ci ildə 68,4 sent/ha, gilas bitkisinin məhsuldarlığı isə respublika üzrə orta hesabla 81,5 sent/ha, Quba-Xaçmaz bölgəsi üzrə 88,1 sent/ha həddində qeydə alınmışdır (1).

Göründüyü kimi, gilas bitkisinin məhsuldarlığı heç də ürək açan səviyyədə deyildir. Eyni zamanda o da məlumdur ki, gilas bitkisinin potensial imkanları bu göstəricilərdən xeyli yüksəkdir və elmi əsaslarla işlənmiş texnoloji qulluq nəticəsində bu bitkilər yüksək məhsul verə bilər. Məlum olduğu kimi, meyvə bitkilərinin məhsuldarlığı cinsdən, sortdan, calaqaltıdan, ağaclara verilən formadan və tətbiq olunan aqrotexniki tədbirlərdən asılı olaraq ciddi şəkildə fərqlənir.

Respublikamız bazar iqtisadiyyatı yolu tutduğundan bu şəraitdə sort daha böyük önəm daşıyır. Çünki sort bazar keyfiyyətləri ilə yanaşı, həmçinin bağçılığın intensivləşdirilməsində əsas elementlərdən olmaqla əkililərin sıxlığının artırılmasına və onların əmtəəlik məhsulvermə dövrünün uzunluğuna birbaşa təsir göstərir (3).

Qeyd olunanları nəzərə alaraq, 2003-cü ildən başlayaraq Quba RAEİM və MÇETİ tərəfindən respublikamıza gilas bitkisinin - Regina, Kordia, Summit, Burlat, Ziraat-0900 sortları introduksiya olunmuş və bu sortlar üzrə yeni meyvə bağları salınmışdır. Eyni zamanda gilas bitkisinin GiselA-5, GiselA-6, Prunus mahaleb L., MaxMa-14 calaqaltı formaları da introduksiya edilmişdir. Bu sort və calaqaltıların respublikamız üçün yeni olduğunu nəzərə alaraq məqalədə sortların qısa təsviri, calaqaltıdan asılı olaraq əkin sxemləri və klon calaqaltılar üzərində gilas bitkisinin formalaşdırılması haqqında məlumat verilmişdir.

**Regina** - Jork Elmi-Tədqiqat Meyvəçilik İnstitutunda Schneiders Spate Knorpel ilə Rube-nin

çarpazlaşması yolu ilə 1957-ci ildə əldə olunmuşdur. Regina sortu Almaniyada 1981-ci ildə bazara çıxarılmışdır. Reginanın meyvələri çox iri, yumru, qaraya yaxın tünd qırmızı, sərt və sulu, xoş ətirli və dadlıdır. Saplağı uzun və qalındır. Meyvəsinin çəkisi 11-12 qramdır. Ağacları dik və qüvvətli piramida şəklində inkişaf edir, olduqca məhsuldar sortdur. Gec çiçəkləyən sortdur. Ziraat-0900 Reginadan 2-3 gün əvvəl çiçək açır. Gecyetişən sortdur, Ziraat-0900 sortundan 7-10 gün sonra, 25 iyun-5 iyulda yetişir. Bir çox bölgələrdə Regina sortu tozlayıcı olaraq Ziraat-0900 üçün istifadə oluna bilər. Ən yaxşı tozlayıcıları Starks Gold, Kordia, Schneiders Nordvanderdir. Ən yaxşı calaqaltıları isə Maxima-14, SL-64 və Brookforestdir.

Dəniz səviyyəsindən 1000 m yüksəkliyə qədər olan ərazilərdə əkilməsi məqsədəuyğundur.

**Kordia** - Gecyetişən sortdur, Ziraat-0900-dən 4-5 gün sonra çiçəkləyir. Çexiya mənşəlidir. Şərqi və Qərbi Avropada geniş becərilir. ABŞ-da Attika olaraq tanınır. Amerikanın ən əhəmiyyətli ixrac olunan Bing sortuna nisbətən daha iri, daha sərt və çatlamaya qarşı daha az həssasdır. Gec çiçəkləyir. Gec çiçək açmasına görə Regina və Ziraat - 0900 üçün tozlayıcı ola bilər. 5-15 iyulda yetişir. Çatlamaya qarşı davamlıdır. Meyvəsi iri, ürək şəklindədir. Bir meyvənin orta kütləsi 11-12 q-dır. Meyvə əti çox sərt toxumalı, tünd qırmızıdır, çəhrayı xəttlidir. Qabıq rəngi tünd qırmızıdır. Ən yaxşı tozlayıcıları Bigarreau gaucher, Regina, Metron Late, Stella, Nordvander sortlarıdır. Ən yaxşı calaqaltıları isə Maxima-14, SL-64 və Brookforestdir.

**Summit** - İri meyvəli, ürək şəkilli gilas sortudur. Çatlamaya qarşı orta dərəcədə davamlılıq göstərir. Meyvəsi tünd qırmızı olub ürək şəkillidir, meyvə əti orta sərtlikdədir. Meyvə kütləsi 8–10 qr, meyvəsinin saplağı orta uzunluqda olub. Meyvə tutumunun yüksək olması üçün 2 və ya 3 müxtəlif tozlayıcı sortla birlikdə əkilməsi lazımdır. Ən yaxşı tozlayıcıları Starks Gold, Kordia, Schneiders Nordvanderdir. Ən yaxşı calaqaltıları isə Maxima-14, SL-64 və Brookforestdir.

**Burlat** - Fransa sortudur. Ağacı orta qüvvətli və yüksəkdir. Məhsuldarlığı sabitdir.

Meyvəsi orta böyüklükdə (8-8,5q) və ürək şəklindədir. Rəngi tünd qırmızı və parlaqdır. Meyvə əti qırmızı, dadlı, çox sulu və orta bərklikdədir. Yığım yetişkənliyinə may ayının ikinci ongünlüyündə çatır. Tozlayıcıları- Giorgia, Lapins.

**Ziraat 0900** - Meyvəsi çox iri, kövrək, sulu, keyfiyyətli və ləzzətlidir. Uzun saplaqlıdır. Rəngi qırmızıdır. Çox gec çiçəkləyir və daşınmaya davamlıdır. Meyvə çatlaması olmur. Dəniz səviyyəsindən 1000 m yüksəkliyə qədər olan ərazilərdə əkilməsi məqsədə uyğundur.

Meyvəsinin orta diametri- 20 mm, uzunluğu isə- 21 mm-dir. Meyvənin orta kütləsi 8,5-9 qr olur.

Klon calaqtılar üzərində 3-cü ilində məhsula düşür və bir ağacın məhsuldarlığı 4-5 kq olur. Tam məhsula 7-8-ci ilində düşür və ağacın məhsuldarlığı 30-35 kq-a çatır. Tozlayıcıları - Starks Gold, Regina, Lambert, Merton Late, Merton Late, Noble, Bigarreau Gaucher, Stella, Summit.

Ağacların bağa əkildikdən sonra məhsula düşməsinin tezləşdirilməsi və potensial məhsuldarlıq dövrünün uzadılması ilə bağlı problemlərin həlli də günün aktual məsələlərindəndir. Məhsula düşmə sortun genetik xüsusiyyətləri ilə yanaşı, həm də calaqaltıdan, cərrahi əməliyyatlardan və fizioloji fəal maddələrin (FFM) tətbiqindən asılıdır. Bu istiqamətdə aparılan tədqiqatlar göstərmişdir ki, klon calaqaltıların tətbiqi ilə ağacların məhsula düşməsi 2-5 il tezləşə bilir. Eyni zamanda zoğların üfüqi vəziyyətə gətirilənə qədər əyilməsi, həmçinin burma, boğma, həlqələmə, ucvurma və s. kimi cərrahi əməliyyatlar hesabına məhsula düşməni tezləşdirə bilir. Bu nəticə həmçinin boy zoğlarında apikal dominantlığı aradan qaldırmaq məqsədilə müxtəlif reterdantların (CCC, alar və d.) tətbiqi ilə də əldə edilə bilir (4;8).

Meyvə bitkilərinin biometrik göstəriciləri və məhsuldarlığı sort xüsusiyyəti və becərilmə şəraiti ilə yanaşı calağaltıdan da xeyli asılıdır. Belə ki, toxmacara calanmış ağacdan fərqlənərək vegetativ artırılan calaqaltıya calanmış ağacda fotosintetik potensialın artması hesabına hüceyrə şirəsinin qatılığı da yüksəlir və nəticədə həddən artıq toplanmış qida maddələri generativ orqanların əmələ gəlməsinə səbəb olur. Bu isə ağacın hər il müntəzəm məhsul verməsi ilə nəticələnir. Eyni zamanda vegetativ calaqaltıya calanmış meyvə bitkiləri tez məhsula düşür, meyvələri iri, standarta uyğun olur. Bu bitkinin çətir həcminin kiçik olması vahid sahədə bitki sayını artırmağa və məhsuldarlığı yüksəltməyə imkan verir (12;13;14;15;16). Qeyd olunanları nəzərə alaraq respublikamıza gilas bitkisinin bir neçə klon calaqaltı forması (GiselA-5, GiselA-6, Prunus mahaleb L., MaxMa-14) introduksiya edilmişdir ki, bunların da bəzi xüsusiyyətləri 1 və 2 saylı cədvəllərdə verilmişdir (9;10;11).

**Cədvəl 1**

**Calaqaltıdan asılı olaraq əkin sxemləri**

| Calaqaltı | Əkin sxemi (m) |
|---|---|
| GiselA 5 | 4x2 |
| GiselA 6 | 4x4 |
| Prunus mahaleb L. | 5x5 |
| MaxMa14 | 5x4 |

**Formavermə:** Son 15-20 il ərzində əkilmiş bağlar, əsasən klon calaqaltılar üzərində olan sortlardan salındığı üçün sıxlaşdırılmış əkin sxemlərindən (4x1,5m, 4x1,25m, 4x1,75m, 5x3, 4x3m və s.) istifadə edilir və buna görə də, həmin bağlarda tətbiq olunacaq aqrotexniki tədbirlər, ekstensiv və adi

intensiv tipli bağlardakı texnologiyadan kəskin şəkildə fərqlənir. Belə ki, superintensiv tipli bağlarda bitkilər əsasən şpalerdə becərildiyindən, bitkilərə verilən forma və budama işləri tamamilə başqa istiqamətdə aparılır. Suvarma, tələb olunan gübrələrin də vaxtaşırı qarışdırıldığı su ilə, damcılama yolu ilə aparılır. Bu bağlarda cərgəaraları əsasən herbisidli qara herik sisteminə saxlanır.

**Cədvəl 2**

**Calaqaltıdan asılı olaraq gilas sortlarının fenoloji inkişaf mərhələləri**

| Calaqaltı | Tumurcuqların şişməsi | Çiçəkləmə başlanğıcı | Tam çiçəkləmə | Çiçəkləmə sonu | Meyvənin yetişməsi | Yarpaq tökülməsi |
|---|---|---|---|---|---|---|
| GiselA 5 | 20-30 mart | 30mart-7aprel | 1-10 aprel | 9-19 aprel | 12 iyun | 12 noyabr |
| GiselA 6 | 23-31 mart | 30mart-6 aprel | 1-8 aprel | 9-16 aprel | 12 iyun | 16 noyabr |
| Prunus mahaleb | 22-31 mart | 31mart-8 aprel | 2-10 aprel | 9-17 aprel | 12 iyun | 10 noyabr |
| Max Ma14 | 21-30 mart | 30mart-7 aprel | 1-9 aprel | 9-18 aprel | 12 iyun | 14 noyabr |

Modern gilas bağında bir çox formavermə üsulundan istifadə edilir. Respublikamızda daha çox tətbiq olunan tərbiyə sistemi “goble”dir (açıq kasa) (Şəkil 1). Üç əsas budaqdan ibarət olan bu forma demək olar ki, bütün meyvə bitkiləri üçün tətbiq oluna bilər. Bu tərbiyə sistemində gövdənin hündürlüyü 15-80 sm olur. Bu zaman gövdədə 3-5 ədəd əsas budaqlar və bu budaqlar üzərində sortlardan və iqlimdən asılı olaraq müxtəlif uzunluqlarda kiçik meyvə budaqcıqları (2-4 göz) inkişaf edir.

Goble tərbiyə sisteminin müsbət cəhətləri:

1. Tətbiq xərclərinin aşağı olması;
2. Asan tətbiq olunması;
3. Dayaq sisteminin tələb olunmaması;
4. Aqrotexniki tədbirlər sisteminin asanlıqla həyata keçirilməsi;
5. Ağaclarda təpə kəsiminin tələb olunmamasıdır.



Son zamanlar müasir bağlarda UPRIGHT FRUITING OFFSHOOTS (UFO) sistemindən istafə olunur.

Bu sistem divar şəklində bir bağ qurulmasına və ağacların tez məhsula düşməsinə səbəb olur. Bu sistemin qurulmasında 4-5 sıra tel lazımdır. Ting əkilən zaman 45 dərəcə bucaq altında əkilməlidir və 50 sm yüksəklikdə ən aşağıdakı telə bağlanılır.



**Şəkil 1. Gilas bitkisində "Goble" tərbiyə sistemi**

lk telin aşağısında zoğlar inkişaf etdikdə onlar kəsilir. Martda gözlər oyandıqda uc hissəyə qədər 30 sm boyunca uzanan budaqları ən altdakı telə bağlanılır. Ana gövdənin boyu ona ayrılan hündürlüyü keçibsə uc hissələri yuxarıya doğru yönəldilməlidir.

Yazın ortasında hər-hansı bir zoğ həddindən artıq böyüyürsə həmin zoğu kəsib götürmək lazımdır. Üst telə catan 8-10 ədəd dik budaq əldə edib tellərə bağlanmalıdır. 2 saylı şəkildə göründüyü kimi sıra boyunca divar görüntüsü əldə edib, dik budaqlarda meyvə əldə etmək lazımdır. Bu sistemin əsas xüsusiyyəti 6-7 yaşdan çox dik budaqların saxlanılmamasıdır. Bu budaqlar kəsilərək yenilənir və zəif inkişaf etmiş dik budaqlar kəsilib götürülür.





Şəkil 2. Gilas bitkisində telli tərbiyə sistemi

**ƏDƏBİYYAT**

**1.Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi. http://www.stat.gov.az/source/agriculture. 2. Bəyəhmədov İ.A. Quba-Xaçmaz bölgəsində qərzəkli və çəyirdəkli meyvə bitkilərinin mütərəqqi texnologiya ilə becərilməsi. Azərbaycan Aqrar Elmi. Bakı, 2018, №2, s. 52-58. 3. Həsənov Z.M., Abbasov Q.C., Süleymanova Y.V., Bəyəhmədov İ.A. Azərbaycanda meyvəçiliyin inkişafının əsas istiqamətləri. AKTA-nın elmi əsərləri, Gəncə, 2006, s.205-209. 4.Həsənov Z. Əliyev C. Meyvəçilik. Bakı, 2011, 519s. 5. Quliyev Z. Qubada meyvəçiliyin tarixi.Bakı, 2014, 67s. 6. Qurbanov İ., Əliyev V.,Babayev B. Meyvəçilik, Bakı, 2009, 236s. 7.Qurbanov İ.S., Əliyev V.M., Qurbanov M.M., Bəyəhmədov İ.A. Azərbaycanda meyvəçiliyin müasir vəziyyəti və inkişaf perspektivləri. Azərbaycan Aqrar Elmi. Bakı, 2014, №3, s. 32-34. 8. Süleymanova Y.V. Zəif boylu armud sortlarının seçilməsi və qiymətləndirilməsi. K.t.e.n. ... dis. Gəncə, 2006, 203 s. 9. Ahu Bolsu, Yaşar Akça. Ziraat Fakültəsi Dərgisi, 2011 , s. 37-43. 10.Hasan CumhurSarısu, Abdullah Konkaya. Süleyman Demirel Üniversitesi, Fen Bilimleri Enstitüsü Dergisi, Türkiye, 2012, 42-47 s. 11.Meyveçilik Araştırma Enstitüsü Müdürlüğü Türkiye 2011, №11, 12 s. 12. Бейахмедов И.А., Гасанов З.М. Биометрические показатели и продуктивность интродуцированных сортов яблони в Куба-Хачмасской зоне Азербайджана. Субтропическое и декоративное садовство, научные труды ГНУ ВНИИЦ и СК РосАСХН, Сочи, 2014, выпуск 51, с.67-72. 13. Бейахмедов И.А., Гасанов З.М. Биометрические показатели и продуктивность сорта - подвойных комбинаций яблони. Современные содоводства, электронной журнал, 2015, №1, с.14-19. 14. Бейахмедов И.А., Джафаров И.Г., Гасанов З.М. Повышение продуктивности семечковых плодовых пород В Куба-Хачмазской зоне Азербайджана. Основные повышения продуктивности агроценозов. Материалы международной научно-практической конференции, посвященной памяти известны ученых И.А. Муромцева и А.С. Татаринцева, 24-26 ноября, Мичуринский- наукоград РФ 2015, с. 78-82. 15. Бейахмедов И.А. Биометрические и производительные показатели растений в сортовые комбинации показатели растений в сортовые комбинации разные подвойные груши. Аграрная наука. 2017, №1, с.12-14. 16. Курбанов И.С., Бабаев А.А., Курбанов М.М., Бейахмедов И.А. Новые интродуцированные подвои яблони и перспективы их использования в садоводстве Азербайджана. Интродукция, сохранение и использование биологического разнообразия культурных растений. Материалы XI международной научно-методической конференции, Махачкала, 2014, Часть 1, с.69-71.**

**Новые интродуцированные сорта черешни**

**И.А.Байахмедов, Р.У.Мамедов**

В статье приведены сведения о новых интродуцированных сортах черешни, их подвоях, о схемах посадки в зависимости из подвоев и новых моденизированных формах кроны деревьев.

***Ключевые слова:*** *Сорта черешни, подвой черешни, интродукция, схемы посадки, формы кроны*

**Newly introduced cherries**

**I.A.Beyehmedov, R.U.Mamedov**

The article provides information about the newly introduced cherries varieties, their rootstocks, planting patterns, depending on the rootstocks and the new modified crown forms of trees.

***Keywords:*** *cherry varieties, cherry rootstock, introduction, planting schemes, crown forms*

***E-mail:*** *islam.beyehmedov@mail.ru*, *rufet_utaridoglu@mail.ru*